*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 190-191 (2015)*

# NAMİQ ƏLİYEV – 75

***İyul ayının 28-də tanınmış alim, Azərbaycan Respublikası Elmi-Tədqiqat Tibbi-profilaktika İnstitutunun direktoru, Azərbaycan Tibb Universitetinin Yoluxucu xəstəliklər kafedrasının müdiri, AMEA-nın müxbir üzvü "Şöhrət" ordenli Namiq Əliyevin 75 yaşı tamam olmuşdur.***



Namiq Nəriman oğlu Əliyev 28 iyul 1940-cı ildə Bakı şəhərində ziyalı ailəsində doğulmuşdur. 1968-ci ildə Azərbaycan Tibb İnstitutunun pediatriya fakultəsini bitirmiş, 1968-70-ci illərdə həmin institutun Mikrobiologiya kafedrasının əyani aspirantı olmuşdur. 1970-ci ildə N.Əliyev "Maqnit sahəsinin bəzi mikroorqanizmlərin morfogenetik və genetik-biokimyəvi xüsusiyyətlərinə təsiri" mövzusunda dissertasiya işini müdafiə edərək tibb elmləri namizədi elmi dərəcəsi almışdır. 1971-ci ildə Azərbaycan Tibb İnstitutunun yoluxucu xəstəliklər kafedrasının assistenti, 1981-ci ildən isə dosenti vəzifələrində çalışmışdır. O, 1981-ci ildə Səhiyyə Nazirliyinin müfəttişi, 1982-1986-cı illərdə Elmi-Tibbi Şuranın sədr müavini, 1986-1991-ci illərdə Elmi-Tibbi Şuranın sədri, 1993-1994-cü illərdə Elm İdarəsinin rəisi vəzifələrində çalışmışdır. 1990-cı ildən Namiq Əliyev Azərbaycan Tibb Universitetinin Yoluxucu xəstəliklər kafedrasının müdiridir.

N.Əliyev ilk dəfə olaraq, elektromaqnit sahəsinin kosmik faktor kimi insan orqanizminin normal mikroflorasına təsiri və orqanizmdə autoinfeksiyanın baş verməsinin mümkünlüyü fikrini irəli sürmüşdür. Onun elmi fəaliyyəti stafilokoklar, streptokoklar, bağırsaq çöpləri, qarın yatalağı çöpləri, serrasiyaların morfogenetik və genetik-biokimyəvi xüsusiyyətlərinin tədqiqi, bəzi patogen və şərti-patogen mikroorqanizmlərin böyüməsi və çoxalmasına dair məsələlərin elmi-nəzəri aspektlərinin öyrənilməsini əhatə etmişdir.

Uğurlu elmi axtarışlarının nəticəsi olaraq, 1988-ci ildə N.Əliyev Moskva şəhərində Mərkəzi ET Epidemiologiya İnstitutunda "Maqnit sahəsinin bir sıra infeksion xəstəliklərin kompleks müalicəsində tətbiqinin klinik-eksperimental əsaslandırılması" mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş, 1989-cu ildə tibb elmləri doktoru elmi dərəcəsini və AAK-nın qərarı ilə "Yoluxucu xəstəliklər" ixtisası üzrə "professor" elmi adını almışdır.

N.Əliyev 1994-cü ildə V.Axundov adına Milli ET Tibbi Profilaktika İnstitutunun direktoru təyin olunmuşdur və hal-hazırda da bu vəzifədə fəaliyyətini davam etdirir.

N.Əliyev infeksion patologiya, mikrobiologiya, epidemiologiya, immunologiya və maqnitbiologiya sahəsində yüksək ixtisaslı bir alimdir. Onun elmi tədqiqatlarının əsas istiqaməti fiziki və kimyəvi faktorların müxtəlif yoluxucu xəstəliklər zamanı orqanizmin immunbioloji davamlılığına təsirinin öyrənilməsi, bir sıra yoluxucu xəstəliklərin diaqnostika, müalicə və profilaktikasının yeni üsullarının işlənib hazırlanması və artıq məlum olan üsulların təkmilləşdirilməsidir.

Namiq Əliyev 300-dən artıq elmi əsərin, dərslik, 4 tədris vəsaiti, 4 elmi-kütləvi kitabça, 3 monoqrafiya, 30-dan çox metodik tövsiyənin və 8 patentin müəllifidir. Onun elmi nəticələri Bolqarıstan, Macarıstan, Türkiyə, İsrail, İran, İspaniya, ABŞ, MDB respublikaları və b. ölkələrdə keçirilən beynəlxalq konqres və simpoziumlarda təqdim olunmuşdur.

Namiq Əliyevin rəhbərliyi altında 16 fəlsəfə doktorluğu, 3 doktorluq dissertasiyası müdafiə edilmişdir.

N.Əliyev Səhiyyə Nazirliyinin yoluxucu xəstəliklər üzrə baş mütəxəssisidir. 1991-ci ildə "Əməkdar həkim", 2000-ci ildə "Əməkdar elm xadimi" fəxri adlarına layiq görülmüşdür. 2001-ci ildə AMEA müxbir üzvü, 2002-ci ildə isə Rusiya Tibb Elmləri Akademiyasının həqiqi xarici üzvü seçilmişdir. 2003-cü ildən başlayaraq, bir neçə il N.Əliyev Azərbaycan Tibb Universitetinin nəzdində "Mikrobiologiya, Gigiyena, Epidemiologiya, Yolu-

xucu xəstəliklər" üzrə İxtisaslaşdırılmış Dissertasiya Şurasının sədri olmuşdur.

N.Əliyev Azərbaycan Elmi-Praktik İnfeksionistlər cəmiyyətinin sədridir. O, Beynəlxalq İmmunreabilitasiya cəmiyyətinin, İmmunreabilitoloqların Amerika assosiasiyasının, Rusiya İnfeksionistlər cəmiyyətinin, Rusiya İmmunoloqlar və İmmunreabilitoloqlar cəmiyyətinin, Azərbaycan İmmunoloqlar və Allerqoloqlar cəmiyyətinin İdarə Heyətinin, bir sıra elmi jurnalların redaksiya heyətinin üzvüdür.

2010-cu ildə Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə səhiyyənin inkişafında xidmətlərinə görə Namiq Əliyev "Şöhrət" ordeni ilə təltif olunmuşdur.